AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 4 (270), 93-100
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.009

D İ A L E K T O L O G İ Y A

# Dialekt leksikasında alınma sözlər (Naxçıvan dialekt və şivələrinin materialları əsasında)

***Nuray Əliyeva***
Filologiya üzrə fəlsəfə doktoru, dosent. AMEA Naxçıvan Bölməsi İncəsənət, Dil və Ədəbiyyat İnstitutu. Azərbaycan. E-mail: naliyeva22@mail.ru
https://orcid.org/0000-0003-0223-5199

**XÜLASƏ**
Məqalədə Naxçıvan dialekt və şivələrində işlənən ərəb və fars sözləri tədqiqata cəlb olunub. Göstərilir ki, dialekt və şivələr də ədəbi dildə olduğu kimi, digər dillərin təsirinə məruz qalır, onun lüğət tərkibinə bu dillərdən müxtəlif sözlər keçir. Bu, daha çox dialekt və şivənin aid olduğu bölgənin coğrafi şəraiti ilə bağlı olur. Yəni buraya bölgənin qonşuluğunda yaşayan və tarixən xalqın daha çox ünsiyyətdə olduğu dillərdən alınma sözlər keçir. Naxçıvan dialekt və şivələrinə isə bu cür sözlər daha çox ərəb-fars dillərindən gəlir. Belə sözlər, adətən dilin daxili qayda-qanunlarına uyğunlaşdırılaraq tələffüz edilir. Məqalədə qeyd olunur ki, ərəb və fars sözlərinin dilimizə və dialektlərimizə kütləvi şəkildə daxil olması XVIII əsrin sonu – XIX əsrin əvvəllərində bir qədər zəifləmiş, sonralar isə öz yerini rus-Avropa mənşəli sözlərə vermişdir.

**AÇAR SÖZLƏR**
dialekt və şivə, leksika, alınma sözlər, ərəb-fars mənşəli sözlər

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 21.10.2021
qəbul edilib: 28.10.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Filologiya elmləri doktoru, professor İsmayıl Kazımov.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 4, VOL. 270, 93-100
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.009

**D I A L E C T O L O G Y**

# Borrowed words in dialect vocabulary (On the basis of materials of Nakhchivan dialect and accents)

***Nuray Aliyeva***
Doctor of Philosophy in Philology, Associate professor. Azerbaijan National Academy of Sciences Nakhchivan section Institute of Art, Language and Literature. Azerbaijan.
E-mail: naliyeva22@mail.ru
https://orcid.org/0000-0003-0223-5199

**ABSTRACT**
The article deals with arabic and persian words used in Nakhchivan dialects and accents. It is shown that dialects and accents, as well as in a literary language, are influenced by other languages, and different words from these languages pass into its vocabulary. This is largely due to the geographical conditions of the region to which the dialect and accent belong. That is, it includes words taken from the languages that live in the neighborhood of the region and are historically the most communicated by the people that such words entered Nakhchivan dialects and accents mostly from arabic-persian languages. Such words are often pronounced in accordance with the internal rules of the language. The article notes that The widespread introduction of arabic and persian words into our language and dialects weakened somewhat in the late eighteenth and early nineteenth centuries, and later gave way to words of Russian-European origin.

**KEYWORDS**
dialect and accent, lexicon, derived words, words of arabic-persian origin

**ARTICLE HISTORY**
Received: 21.10.2021
Accepted: 28.10.2021

## Giriş / Introduction

Dünya dillərinin hər birinin özünəməxsus xüsusiyyəti və qrammatik quruluşu vardır. Buna görə də başqa dillərdən dilimizə keçən sözlər, eyni zamanda həmin dilin dialekt və şivələri bu prosesdə sözü özünün həm fonetik, həm də qrammatik quruluşuna uyğunlaşdırır. Ümumiyyətlə, alınma sözlərin bir qismi əvvəlki formasını saxlasa da, əksəriyyəti daxil olduğu dilin qaydaları əsasında dəyişərək yeni şəklə düşür, daha doğrusu, daxil olduğu dilin qanunlarını qəbul edir. Uzun illər ədəbi dilimizin, o cümlədən dialekt və şivələrimizin lüğət tərkibində, eyni zamanda əsas lüğət fondunda sabitləşən bir çox alınma sözlər bu dilin fonetik və qrammatik qayda-qanunlarını qəbul edərək, həm məna, həm də tələffüz baxımından öz yadlığını itirmişlər. Bu isə hər şeydən əvvəl onunla izah olunur ki, Azərbaycan dilinin fonetik quruluşu öz sabitliyini qoruyaraq, dilə gələn yad sözləri öz tələffüz normalarına uyğunlaşdırır. Ümumiyyətlə, sözalma prosesində dilimizin tələblərinə uyğun gələn sözlər alındığı dildə olduğu şəkildə, yəni dəyişdirilmədən, eynilə mənimsənilir. Bunun əksinə olaraq, dilimizin qaydalarına uyğun olmayan sözlər isə dəyişdirilir.

Alınma sözlərin bir qismi tədricən ədəbi dildən çıxaraq, yalnız dialekt və şivələrdə işlənir. Bəzən isə, danışıq dili vasitəsilə alınan söz ancaq dialektdə qalaraq, ədəbi dilin lüğət tərkibinə keçə bilmir.

Ərəb-fars mənşəli sözlərin dilimizin, eyni zamanda dialekt və şivələrimizin lüğət tərkibində geniş yer tutduğu artıq dilçilikdə məlumdur. Azərbaycanda uzun illər hakimiyyətdə olmuş Ərəb xilafəti bütün ölkəni ərəbləşdirməyə çalışmışdır. Azərbaycan xalqının mədəni həyatında ciddi dəyişiklik edən ərəb siyasəti onun dilinə, əlifbasına, eyni zamanda məişətinə də güclü təsir göstərmiş, dilimizin, o cümlədən dialekt və şivələrimizin lüğət tərkibinə çox sayda ərəb mənşəli sözlər daxil olmuşdur. Məişətimizə daxil olan ərəb-fars mənşəli ifadələr dilimizin spesifik xüsusiyyətlərini qəbul etmişdir. Ümumiyyətlə, yalnız Azərbaycan dili və dialektləri üçün deyil, bütün dillər üçün xarakterik olan alınma sözlərin digər əsas xüsusiyyəti də ondan ibarətdir ki, o, öz həqiqi mənasından az və ya çox dərəcədə uzaqlaşaraq başqa məna ifadə edir. Dialekt və şivələrimizə, o cümlədən Naxçıvan dialekt və şivələrinin lüğət tərkibinə daxil olan ərəb-fars mənşəli sözlərin əsas xüsusiyyəti onların burada sabitləşərək vətəndaşlıq hüququ qazanmasıdır. Ona görə də belə sözləri əsl Azərbaycan sözlərindən ayırmaq bəzən çətinlik törədir. Bu xüsusiyyətə malik olan ərəb-fars mənşəli ifadələr zamanla dilimizin öz sözləri ilə qaynayıb-qarışmışdır.

Qeyd edək ki, İran dilləri türk dilləri ilə hələ erkən vaxtlardan qarşılıqlı əlaqələri olan Hind-Avropa dillərindəndir. Bir çox dilçilər Azərbaycan və fars dillərinin qarşılıqlı əlaqələrinin ilk orta əsrlərdə başlandığını qeyd edirlər [6, s.15]. Bu əlaqələrin qədim köklərə malik olduğunu göstərən faktlardan biri də, fars dilində Azərbaycan sözlərinin mövcudluğudur. Belə ki, bu dilin lüğət tərkibində, hətta bu gün dilimiz üçün arxaik olan bir sıra sözlər öz köhnə formasında saxlanılmışdır. “Qədim İran dilləri qrupuna aid edilən Avesta dilində də bir sıra türk mənşəli sözlərin işlənməsi bunu bir daha sübut edir” [6, s.19]. Xilafətin yürütdüyü ərəb siyasətinə qarşı Yaxın Şərq xalqlarının mübarizəsi Abbasilər sülaləsinin hakimiyyətə gəlməsi ilə nəticələndi. IX əsrdən etibarən, fars dili Yaxın Şərqdə geniş yayılmağa başladı. Bu dil Orta Asiyada, İranda və Azərbaycanda feodal saraylarında rəsmi dövlət dili və ədəbi dil kimi möhkəmləndi. Farsların min ildən artıq hökmranlığı dövründə dilimizin lüğət tərkibinə daxil olan fars mənşəli sözlər leksikanın demək olar ki, bütün sahələrini əhatə edirdi. Göstərilən dövrlərdə fars dilinin hegemon rol oynamasının əsas səbəblərindən biri də, farsların burada böyük nüfuz qazanması, o dövr üçün azərbaycanlıların özlərinə məxsus əlifbanın yoxluğu idi. Səfəvilər dövründə də Azərbaycan dilinin rəsmi dil hüququ tam olmamışdır. Çünki rəsmi dil dövlət dili olmaq deməkdir. Bir halda ki, Səfəvilər dövlətinin sarayında, idarələrdə, rəsmi yazışma işlərində ərəb və fars dilləri Azərbaycan dili ilə eyni dərəcədə işlədilmişdir, deməli, burada tamhüquqlu Azərbaycan dövlət dilindən danışmaq düzgün olmaz. Həmçinin qeyd etməliyik ki, hər hansı bir dilin rəsmi dövlət dili hüququnda olması, həmin dilin əsas təlim-təhsil vasitəsi və tədris dili olması deməkdir. Lakin məlum olduğu kimi, XVI əsrdə Azərbaycan dili belə bir hüquqa malik deyildi.

“Tarixi dəyişikliklər Naxçıvan dialekt və şivələrinin leksikasında müəyyən iz buraxmışdır ki, bunlar müxtəlif leksik qatlar şəklində şivələrin lüğət tərkibində özünü göstərir” [1, s.197]. Müqayisə etsək görərik ki, dilimizdə, o cümlədən dialekt və şivələrimizdə fars mənşəli sözlər ərəb mənşəli sözlərə nisbətən azlıq təşkil edir. Bunun əsas səbəbi ondadır ki, dinin möhkəm kök saldığı bir vaxtda fars dilində də dini termin və dinlə bağlı sözlər geniş şəkildə işlədilmişdir. Tədqiqatçıların fikrincə, ərəb sözlərinin əksəriyyəti dilimizə fars dili və fars dilində yazıb-yaratmış azərbaycanlı müəlliflərin əsərləri vasitəsilə keçmişdir [6, s.17]. Bu sözlərin şivələrdən seçilmiş bir neçə nümunəsinə diqqət yetirək:

*Bədnam etmək, beddam etmək* – Naxçıvan dialekt və şivələrinin, demək olar ki, hamısında “adını biabır etmək” mənasında geniş şəkildə işlənir. Mənşəyinə görə fars dilinə məxsus olan bu sözə Azərbaycan dilinin digər dialekt və şivələrində də rast

gəlmək mümkündür. Belə ki, Qərbi Azərbaycan şivələrində də beddam "biabır, rüsvay", beddam olmaq "biabır olmaq" formasında işlənən bu söz, fars dilindəki "bəd" və "nam", "adı pisliyə çıxmış, pis ad qazanmış//biabır olmuş, rüsvay olmuş" sözünün təhrif olunmuş forması olub, dialekt variantıdır. Eyni zamanda, fars dilində "rüsvayçılıq, biabırçılıq" mənasında "bədnami" sözü də işlədilir.

*Bazburutdu* – Naxçıvanın əksər rayonlarında bu söz "boy-buxunlu, görkəmli" mənasında işlənir. "Bazburt" sözü isə eyni zamanda "boy-buxun, qamət" deməkdir. Dialekt və şivələrimizin lüğət tərkibinə fars dilindən keçən və müəyyən dəyişikliyə uğrayan bu sözün kökü həmin dildə "bazu" şəklində işlənir və qolun çiyindən dirsəyə qədər olan hissəsi mənasını verir. Naxçıvan dialekt və şivələrində, o cümlədən Azərbaycan dilinin digər dialekt və şivələrində bu söz "bazı" formasında işlənərək, "cütün, kotanın ən uzun hissəsi, ana hissəni boyunduruqla birləşdirən ağacı" bildirir. "Bazburt" sözünün də, görünür, xalq dilində "görkəmli" mənasında işlənməsi təsadüfi deyildir. Belə ki, xalq qolu qüvvətli, qamətli insanları adlandırmaq üçün bu sözdən istifadə etmişdir. Eyni zamanda, fars dilində həmin söz məcazi mənada "qüdrət", "əzəmət", "qüvvə" anlamı da daşıyır. Azərbaycan dilinin digər dialekt və şivələrinin bir çoxunda da bu sözə "boy-buxun" mənasında "bazburt", "gözəgəlimli", "boy-buxunlu" mənasında "bazburtdu" variantında rast gəlirik.

*Bəhrə* – "keçmişdə məhsulun onda biri tutarında alınan vergi" mənasında Naxçıvanın Şahbuz və Culfa şivələrində işlənir. Bu söz də fars dilindən şivələrin lüğət tərkibinə keçmiş sözdür və alındığı dildə də eyni mənada, yəni "keçmişdə mülkədarların kəndlinin məhsulundan aldığı məhsulun yarısı və ya dörddə biri tutarında pay" anlamında işlənmişdir [7, s.32]. Bununla yanaşı, bu söz fars dilində "pay", "hissə", "fayda", "nəticə", "qazanc", "məhsul" mənalarında da işlənir. Qeyd edək ki, ədəbi dilimizdə olduğu kimi, dialekt və şivələrimizin də lüğət tərkibinə texnikanın inkişafı ilə əlaqədar hər gün yeni sözlər daxil olur. Bəzi əşya və məfhumlar tədricən məişətimizdən çıxdıqca, onların adları da özləri kimi köhnələrək, passiv fonda keçir ki, "bəhrə" də belə sözlərdəndir. Belə ki, bu söz vergi mənasında bu gün dialekt və şivələrimizdə demək olar ki, işlədilmir. Lakin həmin sözün dildə alınan digər mənaları bu gün də dilimizdə işlənməkdədir.

*Bəsti, bərni* – "kiçik dolça" və ya "kiçik səhəng" mənasında işlədilir. Hələ qədim dövrlərdən ulu babalarımız təbiətin müxtəlif nemətlərindən ustalıqla istifadə edərək, məişətləri üçün əməli əhəmiyyətə malik olan bir çox əşyalar düzəltmiş və onlara ad vermişlər. Elə "bərni" də Naxçıvan ərazisində yayılan qədim dulusçuluq sənətinin bir nümunəsidir. Gildən hazırlanan və məişətdə geniş işlənən bu qab səhəngə nisbətən kiçik olub, quruluş etibarilə də ondan fərqlənir. Bərni dar boğazlı,

kiçik qulpludur. Onun ağzı möhkəm tıxacla bağlanır və suyu sərin saxlayır. Keçmiş zamanlarda əkinçiliklə məşğul olan yerli əhalinin əksəriyyətinin bərnisi var idi. Yüngül və rahat olduğu üçün qulpuna ip bağlayıb yanlarında gəzdirərdilər. Xüsusilə, biçinə, xırmana, bostana işləməyə gedən kəndlilər bərnidən çox istifadə edər, günün ən qızmar vaxtında işləyəndən sonra bərnidəki sudan içib sərinlənərdilər. İndi də Naxçıvan kəndlərinin bəzilərində qorunub saxlanan bu qədim saxsı qaba təsadüf olunur. Bu söz mənşəcə fars sözü olub, Şərqi Abşeron şivələrində "bəsti" variantında işlənir [9, s.56].

*Dərbeçə* – Naxçıvanın demək olar ki, bütün rayonlarında həyətin əsas, böyük qapısından əlavə kiçik bir qapısı da olur. Bu qapı xalq arasında dərbeçə adlandırılır. Bu, fars mənşəli sözdür və həmin dildə "kiçik qapı, qapıcıq" mənasında işlədilir. Azərbaycan dilinin digər dialekt və şivələrində də bu sözə rast gəlmək mümkündür. Belə ki, Qərbi Azərbaycan şivələrində bu sözə "dərbəçə" variantında "həyət qapılarının ən kiçiyi, əldəqayırma həyət qapısı" mənasında rast gəlirik [4, s.124].

*Kahal, kal* – Naxçıvan dialekt və şivələrində "anlamaz, tərs" mənasında işlənir. Kahal ərəb mənşəli "kahil" sözünün dialektdə fonetik cəhətdən dəyişilmiş formasıdır. Üslubi məqamdan və şivədəki tələffüzündən asılı olaraq, bu söz müxtəlif məna çalarlığını bildirir. Söz Azərbaycan dilinin digər dialekt və şivələrində, o cümlədən Şərqi Abşeron, Dərələyəz, Vedi, Zəngibasar şivələrində "tərs, qanmaz, könülsüz" mənalarında, eyni zamanda "tənbəl adam" mənasında da işlədilir [2, s.265]. Naxçıvan dialekt və şivələrində isə bu sözə "tənbəllik" mənasında "kahıllıx" variantında rast gəlmək mümkündür.

Dilimizin lüğət tərkibinə və əsas lüğət fonduna daxil olan ərəb-fars mənşəli sözlər XVIII əsrin sonu – XIX əsrin əvvəllərində bir qədər zəifləmiş, sonralar isə öz yerini rus-Avropa dillərindən keçən sözlərə vermişdir.

Azərbaycan dilinin qaydaları əsasında forma və məzmunca tam milliləşmiş alınma sözlərin əsl Azərbaycan sözləri deyil, ərəb və ya fars sözləri olduğunu ancaq etimoloji təhlil və müqayisəli-tarixi metod əsasında müəyyənləşdirmək mümkündür. Azərbaycanlaşmış ərəb mənşəli sözlərin spesifik xüsusiyyətlərini kökün strukturu, "kök samitlər" əsasında açmaq olar [4, s.27].

Bölgənin yerli sakinlərinin leksikasında oyun adları, xörək və başqa qida məhsullarının adları, toxuculuq, dülgərlik, quş adları, meyvəçilik və başqa sahələrə aid alınma söz və terminlərin də çox işləndiyini görmək mümkündür. Qeyd edək ki, dialekt və şivənin fərqli cəhətlərinin üzə çıxarılması işində materialın haradan və kimlərdən toplanmasının böyük əhəmiyyəti var. Mahmud Kaşğari yazırdı: "Ləhcə və şivələrin ən fəsihi bir lisandan başqa lisan bilməyən, farslarla qarışmayan, şəhərlərə

enmək adətində bulunmayan xalqlarda bulunur. İki lisanda qonuşan, şəhər xalqı ilə ixtilatda bulunan xalqların dilində rəkət, qarışıqlıq bulunur" [3, s.161]. Aparılan bu cür araşdırmalar həm də dialekt və şivələrimizin qədim dövrlərdəki mənzərəsini göz önündə canlandırır. Çünki tədqiqat zamanı elə sözlərə rast gəlirik ki, onlar ya müasir dövrümüzdə artıq işlədilmir, ya da işlənmə tezliyi azalaraq, tədricən arxaikləşmişdir. Lakin dialekt və şivələrimizdə bu sözlərin istifadəsinə rast gəlinir. Bu qəbildən olan bəzi sözlərlə qədim abidələrimizdə, klassiklərimizin əsərlərində də qarşılaşırıq. Həmin sözlər müasir ədəbi dilimizdə fərqli fonetik variantda istifadə olunur.

## Nəticə / Conclusion

Ümumiyyətlə, Naxçıvan dialekt və şivələrinin leksikası kifayət qədərdir. Burada ədəbi dillə və digər qrup dialekt və şivələrlə həm oxşar, həm də fərqli cəhətlər olduqca çoxdur. Buna görə də məhz ədəbi dilin təsiri altında dilçiliyin bu qolu istiqamətində inkişaf gedir, dialekt və şivələrin lüğət tərkibi ədəbi dilin hesabına zənginləşir. Eyni zamanda, ədəbi dil də buradan bəhrələnərək, öz leksikonunu genişləndirir.

Naxçıvan dialekt və şivələrinin lüğət tərkibi digər dialekt və şivələrimizdə olduğu kimi, uzun əsrlərin məhsuludur və burada ana dilimizin keçdiyi tarixi inkişaf yolu, həyatı, məişəti ilə bağlı olan çox sayda köhnə söz və ifadələri müşahidə edirik ki, bunlar da dilimizin tarixini özündə əks etdirir. İnkişaf prosesində bu dilə, o cümlədən onun dialekt və şivələrinə alınma sözlərin daxil olması qaçılmazdır. Dillər qarşılıqlı ünsiyyət nəticəsində bir-birinin lüğət tərkibini zənginləşdirir. Lakin bunun da geniş hal almasına, lazım olmayan sözlərin dilimizə kütləvi şəkildə keçməsinə yol vermək olmaz. Dilin zənginləşməsi onun öz daxili imkanları, dialekt və şivələr, o cümlədən qohum dillər hesabına da baş verə bilər ki, bu da dilin lazımsız yad ünsürlərlə çirklənməsinin qarşısını almağın ən yaxşı yoludur.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Azərbaycan dilinin Naxçıvan qrupu dialekt və şivələri. (1962). Bakı, Azərb. SSR EA nəşriyyatı. 326 s.
2. Azərbaycan dilinin dialektoloji lüğəti, 2 cilddə, I c. (1999). Ankara, Türk Dil Kurumu Yayınları. 661 s.
3. Azərbaycan dilinin Muğan qrupu şivələri. (1955). Bakı, Azərb. SSR EA nəşriyyatı. 264 s.
4. Bayramov İ. (2011). Qərbi Azərbaycan şivələrinin leksikası. Bakı, Elm və təhsil. 440 s.
5. Əzizov E. (1999). Azərbaycan dilinin tarixi dialektologiyası. Bakı, Bakı Dövlət Universiteti nəşriyyatı. 354 s.
6. Tahirov İ. (2004). Dialekt leksikasında alınma sözlər. Bakı, Nurlan. 136 s.
7. Məzəmli F.İ. (2004). Azərbaycan dilində fars sözləri lüğəti. Bakı, Çıraq. 200 s.
8. Şirəliyev M. (1967). Azərbaycan dialektologiyasının əsasları, II nəşr. Bakı, Maarif. 421 s.
9. Vəliyeva G.Q. (2001). Şərqi Abşeron şivələrinin leksikası. Bakı, Elm. 167 s.